AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 3 (269), 92-104
https://dx.doi.org/10.48445/k5595-8343-2283-m

XALQ YARADICILIĞI

# “Bir hikmət görmüşəm, xəyalım çaşıb” (Aşıq Ələsgərin yaradıcılığı əsasında)

***Mahmud Allahmanlı***
Filologiya elmləri doktoru, professor. Azərbaycan Dövlət Pedaqoji Universiteti, Ədəbiyyat kafedrası. Azərbaycan. E-mail: m.allahmanli@mail.ru
https://orcid.org/0000-0002-5947-7669

**XÜLASƏ**
Aşıq sənətinin, eləcə də ustadlar ustadı Aşıq Ələsgərin poeziya atlasının müəyyənləşdirdiyi mənzərə unikallıq anlamında, tarix və coğrafi baxımından bir sonsuzluq yaratmışdır. Göyçə bu sonsuzluğun episentri olmaqla, həm də folklor yaddaşının müəyyənləşdirdiyi sənət kriteriyalarına söykənir, Dərbənd, Borçalı, Təbriz, Urmiya, Zəncan, Savə, Kərkük və s. boyu ozanların qopuzunda, aşıqların sazında səslənir. Ozanların qopuzu, aşıqların sazı, Oğuz Kağanın “mən Oğuzun kağanı oldum” təsəvvürü, Xan Qazanın alplarının müəyyənləşdirdiyi həyat prinsipi, Qoç Koroğlunun Çənlibel nizamı, Xıdır Nəbi, Novruzun mərasim səviyyəsində arxaik yaddaş kodu və s. – hamısı bu sırada Göyçə səviyyəsində “Ələsgəri səslədim, hay verdi Göyçə mənə” konsorsiumuna bağlanır. Folklorun, eləcə də aşıq yaradıcılığının stixial panoraması qopuzun və sazın, Aşıq Ələsgər timsalında ustadların müəyyənləşdirdiyi müqəddəs sənət və həyat prinsipinə bağlanır. Bütün bunlar sənət və yaradıcılıq anlamında sistemli yanaşmaları, tarixi-mədəni axarın dinamikasını diqqət önünə gətirir və müxtəlif istiqamətli təhlilləri bir zərurət olaraq qarşıya qoyur.

**AÇAR SÖZLƏR**
ozan-aşıq yaradıcılığı, ustad aşıqlar, Aşıq Ələsgər, Göyçə aşıq mühiti, ustadnamələr, aşıq rəvayətləri

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 12.07.2021
qəbul edilib: 17.07.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 3, VOL. 269, 92-104
https://dx.doi.org/10.48445/k5595-8343-2283-m

**F O L K L O R E**

# "I had a wisdom and my dream was confused" (Based on the work of Ashug Alasgar)

***Mahmud Allahmanli***
Doctor of Philological Sciences, Professor. Azerbaijan State Pedagogical University, department of Literature. Azerbaijan. E-mail: m.allahmanli@mail.ru
https://orcid.org/0000-0002-5947-7669

**ABSTRACT**
The landscape defined by the ashug art, as well as the poetry atlas of the master Ashug Alasgar, is unique in terms of history and geography in terms of uniqueness. Being the epicenter of this infinity, Goycha also stands on the criteria of art determined by the memory of folklore. The song of the poets, the music of the ashugs, Oguz Kagan's idea "I became the kagan of Oguz", the principle of life defined by Khan Kazan's alpines, Koch Koroglu's Chanlibel order, Khidir Nabi, the archaic memory code of Novruz at the ceremonial level, etc. and so on. All of them are connected to the consortium "I called Alasgar, Goycha gave me to Goycha" at the Goycha level. The spontaneous panorama of folklore, as well as the work of ashugs, is connected with the sacred art and way of life (principle) defined by masters in the example of kopuz and saz, Ashug Alasgar. All this brings to the forefront systematic approaches in the sense of art and creativity, the dynamics of historical and cultural currents, and makes it necessary to analyze in different directions.

**KEYWORDS**
ozan-ashug creativity, master ashugs, Ashug Alasgar, Goycha ashug environment, masterpieces, ashug legends

**ARTICLE HISTORY**
Received: 12.07.2021
Accepted: 17.07.2021

## Giriş / Introduction

Dədə Qorquddan üzü bəri gələn sənət axarında Ozan Heydər, Ozan İbrahim, Ozan Cəlil, Miskin Abdal, Qurbani, Abbas Tufarqanlı, Sarı Aşıq, Lələ, Ləzgi Əhməd, Xəstə Qasım, Tahir Mirzə, Qərib, Dədə Kərəm və s. kimi tarixin ayrı-ayrı dövrlərində yaşayıb yaratmış onlarla sənətkar öz peşəkarlıq qabiliyyətləri ilə xalqın yaddaşında əbədiləşmişlər. Dədə olmadan Haqq aşıqlığına, Miskin aşıqdan Xəstə aşığa qədər müxtəlif təsəvvür kodları özü ilə birgə bizim reallıq olaraq şifrələrini aça bilmədiyimiz yaddaşın müəmmalarla dolu daha dərin qatlarına diqqətimizi yönləndirir. Çünki sıralanmada yarıəfsanəvi, yarıreallığa bağlanan müxtəlif adlar silsiləsi günümüzə qədər gəlib çatanların həm də metaforik qatlarında olanlara yüklənir. Etnosun mədəniyyət və toplum təsəvvüründə oturuşmuş qəliblər sırasında aşıqlıq (ozanlıq) qədər arxaik yaddaşa bağlı və ilkinlikdən günümüzə qədər gəlib çatanlara sahib çıxmaq missiyasında ikinci bir xətti onun bərabərinə qoymaq olmur. Qalanları tarixin müəyyən mərhələsində qoşulma (meydanagəlmə) forması ilə təzahür edir və etnosun müəyyənləşdirdiyi kriteriyalar əsasında (həm də oradan keçməklə) özününküləşir. Türk təsəvvüf ədəbiyyatı adı ilə tanınan orta əsrlərin məfkurə axarı özündən daha qədimlərə bağlanan ozan (aşıq) sənət ənənəsi ilə yanaşı addımlayır. Daha doğrusu, Dədə Ələsgərin “həm aşıqdır, həm dərvişdir” qənaətində olması, həm də oradan qaynaqlanır.

Aşıq Ələsgərin yaradıcılığı timsalında arxaik qatlar və tarixi axarın orta əsrdən üzü bəri gələn axarı bütün aspektləri ilə diqqət çəkir. Xalq şairi S.Vurğunun “onunku haqq vergisidir” söyləməsi, bu kompleksin polifonik və stixial mahiyyətində oturuşmuş arxaik düşüncədən günümüzə daşınanları ifadə edir. “Özünəməxsus təbii gözəlliklərə malik olan Göyçə əsrlərdən bəri sazın və onun köməyi ilə yaradılan, müşayiəti ilə ifa edilib yaşadılan sözün ən isti, ən mehriban ana qucaqlarından biri olmuş, indi də, şübhəsiz ki, gələcəkdə də uzun müddət belə olacaqdır. Mübaliğəsiz demək olar ki, bu mahalda saz çalmağı, söz deməyi heç bacarmayan adama ancaq nadir hallarda təsadüf edilir. Onların əksəriyyətini isə aşıqlıq ənənələrinin ən incə sirlərinə vaqif olanlar təşkil edirlər. Sənətin bu yerlərdə belə dərin kök atıb, belə geniş yayılması, hətta sözün həqiqi və tam mənasında məişətə daxil olması mahalın təbii şəraiti, coğrafi mövqeyi və yada gəlməz uzaq keçmişlərdən bəri burada yaşayan qəbilələrin, tayfaların yaradıcılıq ənənələri ilə bağlıdır” [11, s.5].

Göyçə qədim türk yurdu olmaqla bütün istiqamətlərdə mədəniyyətimizin, düşüncəmizin beşiyi olan məkan, etnokulturoloji yaddaşımızın ana qaynaqlarındandır.

Kərkükdə rübabın dili ilə bülənd olanlar Göyçədə, Borçalıda, Təbrizdə, Dərbənddə qara sazın simlərinin səsləndirdiyi avazlanmalarla bütünlükdə türk ellərinin ruhunu oxşayır. Ruhunun dili olaraq ötür və göylərin yeddinci qatında qəlblərə bir sərinlik gətirir. Çoban tütəyinin səsləndirdiyi təranələrlə dünyanın o başından günümüzə gələnlərin könül rübabının səs-sədası olaraq gedəcəyimiz yola işıq tutur. Aşıq Ələsgər bu möhtəşəm, həm də ucu-bucağı görünməyən axarda bir şimşək kimi çaxır. Arxaik yaddaşdan günümüzə gələnləri hərəkətə gətirməklə ona sahiblik missiyasını tərəf olaraq ortaya qoyur.

Göyçənin Oğuz yurdu olaraq işarələdiyi yaddaşın mövcudluq və özgürlük tərəfində qopuzun (sazın), ozanın (aşığın) ortaya qoyduğu məzmun onun bir növ şifrələnmiş mədəniyyət və mənəviyyat kodudur. “Eldən-elə, bəydən-bəyə ozan gəzər, ər comərdin, ər nakəsin ozan bilər” təsəvvürü tarixin və etnosun “yüz ölçülüb, bir biçilmiş” müdrikliyinin söyləmidir. Sazın və qılıncın orta əsrlərin çox-çox dərinliklərindən günümüzə qədər ayaq üstə tutduğu mövcudluq düsturu gələcəyə gedişimizin həm də müqəddəs və yazılıb-pozulması mümkün olmayan əmanət örnəyidir. Dədə Qorqudun bir el ağsaqqalı kimi öz xeyir-duası ilə oğuzun dövləti Ulaş oğlu Xan Qazanın qəhrəmanlığı, “çal qılıncın, ağam Qazan” deyən alp ərənlərin harayı, eləcə də Aşıq Cünunun sazının səsləndirdiyi qəhrəmanlıq sədaları ilə Koroğlunun Misri qılıncının sərgilədiyi məzmun etnosun keçib gəldiyi yolun müəyyənləşmiş və əsrlər boyu sınaqlardan çıxmış formuludur. Dədə Ələsgər bu möhtəşəm yolun axar-baxarında Dədə Qorquddan, Miskin Abdaldan, Qurbanidən, Abbas Tufarqanlıdan, Sarı Aşıqdan, Xəstə Qasımdan üzü bəri daşınanların dədəlik modeli olaraq baş qaldırır.

Yaxşı hörmət ilə, təmiz ad ilə,
Mən dolandım bu Qafqazın elini.
Pirə ata dedim, cavana qardaş,
Ana-bacı bildim qızı, gəlini [1, s.208].

Aşıq bu misralarda bir tərəfdən özünün sənətkar obrazını, hansı dəyər və mənəvi prinsipləri yaşam tərzinə çevirməsini diqqət önünə gətirirsə, digər tərəfdən də ümumi kontekstdə aşıqlığın sənətkar obrazını (statusunu) öz timsalında təqdim edir. Xalq arasında “aşıq elin anasıdır” təsəvvürü əski çağlardan – şamandan, ozandan bu yana

möhtəşəm bir ənənə ilə faktlaşır. İsmayıl Bəhrami aşığı türkün “sədaqət, nəcabət dölü olaraq vurğulayır, həm də bu təsəvvürdə “zalımın önündə çökməz dizi, eşidən qulağı, görən gözü, dərdini söyləyən dili” olaraq səciyyələndirir. “Mərifət elmində kamil gərəkdir” – deyən Dədə Ələsgər, Qafqaz ellərini məhz bu düşüncə ilə gəzib dolaşmış, çətin vaxtlarında sazın və sözün ürfani məzmununa əlavə ovqat qatmışdır. Ustadın özünün timsalında müəyyənləşən meyarlar bütünlükdə sənətin qəlibləşmiş təsəvvürünə bağlanmaqla Aşıq Ələsgər ucalığını diqqət önünə gətirir. “Pirə ata, cavana qardaş” deyən ustad, “ana-bacı bildim qızı, gəlini” əlavəsi ilə sənət ənənəsinin nəyə dayanmasını, “el sənətkarı” olmanın meyarını cızır. Xalq şairi O.Sarıvəlli məhz bu mədəniyyət kompleksinin bir başqa tərəfinə diqqət yetirir və “aşıq eldən alar öz nəfəsini” söyləməklə onun sənət qaynağında dayananlarla xalq təsəvvüründə müəyyənləşmiş “sənət” və “sənətkar” rəsmini yaradır:

Sadəcə görünən ustadnamələr,
Dərin dəryalardan daha dərindir,
O şirin mahnılar, zərif qoşmalar
Ustadlar ustadı Ələsgərindir! [9, s.183].

Kəlməsindən ləli-gövhər süzülən ustadın dərsini Haqq-təala vermiş, qırxlar piri “doxsan min kəlməni ona bəyan etməklə” sazın və sözün ecazkarlığını Göyçənin Miskin Abdaldan, Ozan Heydərdən, Ozan İbrahimdən, Ozan Cəlildən və daha dərinlərdən gələn “imran dillə” danışdırma təsəvvürünə qaldırmışdır. XVI əsrin keşməkeşlərindən şimşək kimi sıyrılan və bütün mənəvi ucalıq mərtəbəsi ilə “miskinlik”, “abdallıq” dərəcəsinə yüksələn “Seyid Miskin Abdal mənəm, söz mənim, meydan mənim” fikri ilə bütünlükdə özünəqədərki mərhələnin açılmasına (bir qədər də müşkül olan geneoloji sisteminə) diqqət yönəldir. Gözəllik nəğməkarı kimi yaddaşlara adını yazdırmış Aşıq Ələsgər gəraylı, qoşma, ustadnamə, təcnis (təcnisin müxtəlif növləri), dodaqdəyməz, dildönməz, divani, müxəmməs və s. örnəkləri ilə könüllər dünyasının fatehi zirvəsinə yüksəlmiş, bir növ könül dostu, qəlb sirdaşı kimi böyükdən kiçiyə onu dinləyənlərə həmdəm olmuşdur. “Qürbətdə, hicranda, vüsal dəmində” nəğməsi, sözü ilə ustad onu dinləyənlərdən bir an belə ayrı qalmır, əksinə, yol yoldaşlığı edir, dərdini, sevincini onlarla bölüşür. Təşnə ruhlara çilənən və onlara sərinlik gətirən bu sətirlərin könül odu nəinki azalır, əksinə, həmişə artan istiqamətdə inkişaf edir. “Bilmirəm”, “Yaylaq”, “Gəlsin”, “Bəylərin”, “Bu dağlar mənim”, “Dağlar”, “Dolanır”, “Düşdü”, “Əvəzdi”, “Arasında”, “Varıymış”, “Qoca baxtım”, “Döndü, nə döndü”, “Dünyada”, “Eylər”, “Yaman at”, “Kəsildi”, “Gərəkdi”, “Olacaqdı”, “Olmaz”, “Çəkirsən”, “Çıxıbdı”, “Annax bəy”, “Görmədim”,

"Hayıfsan", "Danışaq" və s. bu kimi poetik örnəklər dünya ədəbiyyatının ən möhtəşəm sənət abidələri ilə yarışacaq səviyyədədir. Fonopoetik, morfopoetik, sintaktik sıralanmanın kəsb etdiyi bütövlük bütün parametrlərdə öz rişəsi, söz yaddaşı ilə musiqi dalğalarında qanadlanan ritmlənmə ağlın belə gedib çata bilməyəcəyi ucalıqlara qədər yüksəlir. "Dilqəmi", "El havası", "Göyçə gülü", "Zarıncı Kərəmi", "Yurd yeri", "Orta Sarıtel" və s. havaların axar-baxarında süzülüb gedən söz sıralanması ruhun yazısı və dili olaraq diqqət önünə gəlir. Bunların bir təsəvvür, düşüncə hadisəsi olaraq sərgilədiyi məzmunu Dədə Ələsgər "sazınnan, sözünnən, düz ilqarınnan, ellərdə söhbəti qaldı ki, qaldı" deməsi ilə təsdiqləyir.

Söz sıralanmasındakı assosiativ bağlar şeirin ritm dalğalanmaları ilə məzmun qatlarında elə bütövlük yaradır ki, onu öz səviyyəsində elmi kontekstdə təhlilə gətirmək mümkünsüz görünür. Çünki Aşıq Ələsgərdə olan böyük Azərbaycan şairi S.Vurğunun dediyi "Haqq vergisi idi". Ustad sənətkarın bütün poetik örnəklərində nəzərə çarpan formul elementləri formal qəlib səviyyəsində görünməkdən əlavə, həm də janr tamlığında mənayaradıcı məzmunu, bədii ünsürlərin struktur-semantik əlaqə qatlarında daha geniş faktura ilə diqqət önünə gəlir. Sintaktik fiqurlar sənətkarın estetik məlumat və ifadə formasının ortaqlığında məzmunun yeni, eyni zamanda orijinallıqla nəzərə çarpacaq çalarlarını ortaya qoyur. "Aşıq Ələsgərin ən önəmli xüsusiyyətlərindən biri də onun öz sələfləri olan klassik aşıqlarımızın – Qurbani, Abbas Tufarqanlı, Xəstə Qasım, Ağ Aşıq, Aşıq Alı, Sarı Aşıq və başqalarının zəngin yaradıcılığından qidalanaraq təkrarçılığa, təqlidçiliyə yol vermədən aşıq sənətini inkişaf etdirməsi, daha yüksək bir zirvəyə çıxara bilməsidir" [8, s.5]. Ozan Heydər, Ozan İbrahim və Ozan Cəlil üçlüyünün, eləcə də daha əski təsəvvürdən gələn tarixi-mədəni axarın yeni dalğası bizə yaxın olan zamanda Ağ Aşıq, Aşıq Alı və Aşıq Ələsgər timsalında qopuzdan saza gələn mədəniyyət tipinin elə bir mərhələsini ortaya qoyur ki, o, bütün parametrlərdə nümunəyə çevrilir. Həmin inkişafın Göyçə timsalında yüksələn xətti isə Aşıq Ələsgərlə bütövləşir.

Klassiklər poeziyanın ruhunu xalqın ruhu olaraq təhlil edirlər. S.Vurğun "yalnız şeirin dili belə danışır, onda Tanrının əbədi olacaq hikməti var" – söyləyirdi. Aşıq Ələsgər poeziyasında estetik axar öz ifadə forması ilə həm də məzmunyaratma və nitq formulunun mükəmməlliyi ilə bütövləşir. Sanki sazın simlərindən qopan ecazkar dalğalanma sözün akustik avazlanması fonunda tamamlayıcı rolunda çıxış etməklə biri digəri üçün öz bətnində bədii-estetik intelleksiyasını hazırlayır. Burada gerçəkliyi əvəzetmənin poetik universium olma baxımından sərgilədiyi məzmun aşıq şeir sisteminin forma obyektini heç də arxa plana keçirmir. Əksinə, bunların tamlığında

nümunənin ecazkarlıq təsəvvürü diqqət önünə gəlir. Aşıq sənətində şeirin kanonik sistem mükəmməlliyi, eləcə də saz dilinin, havacatın yaratdığı avazlanma akordları bütünlükdə məzmunyaradıcı mahiyyəti ilə sənətkar istedadına bağlanır. Bunlar Aşıq Ələsgər yaradıcılığında özünün elə bir mərhələsini yaşayır ki, onu ancaq Aşıq Ələsgər şeirinin ruhani mənzərəsini müəyyənləşdirməklə ölçüyə gətirmək olar. "Qurbanı, Abbası, Əmrahı anıb, Kərəmlə alışıb, Dilqəmlə yanıb", – deyən xalq şairi H.Arif həm də əlavəsində "tütəklə uyuyub, sazla oyanıb, kamanla dil açıb ötdü babalar" məsələsini diqqət önünə gətirir. "Göyçədə cocuq sazın sədasını sözün sədasından daha əvvəl eşidir. Sözün laylası ilə körpə hər yerdə, sazın laylası ilə isə təkcə Göyçədə gözünü və dilini açır.

Bu layla – rübabın simində, qopuzun telində dilə gələndə bayatı, oxşama, Burlanın, Selcanın, Banunun dilində zilə gələndə isə beşikdə ərsəyə çatanda artıq Qazan xan, yalnız Bamsı Beyrək, ya da Dəli Domrul özü olur. Burla xatun, Selcan xatun, Banuçiçək bu laylanı min illərdir ki, çalır, oxuyur və millətinin körpəliyini hələ də beşikdə yırğalayır" [6, s.4].

Ümumiyyətlə, orta əsrlərin dərinliklərindən üzü bəri xalqın mənəvi və ideoloji düşüncəsində saz qədər rahatlıq tapdığı və onun ilahi avazında ümidləndiyi ikinci bir musiqi aləti olmayıb. Etnosun şifrələdiyi mədəniyyət kodu onun tapındığı, həm də sığındığı saz (qopuz) olmuş, könlünü ona verərək sazın avazında özünü, taleyini görmüş, ümidlənib müşkülünü onun dil-dil çağlayıb ötdüyü qəhrəmanlıq nəğmələrində tapmışdır.

Hanı mən gördüyüm qurğu-büsatlar?!
Dərdməndlər görsə, tez bağrı çatlar,
Mələşmir quzular, kişnəmir atlar,
Niyə pərişandı halların, dağlar?

Hanı bu yaylaqda yaylayan ellər?!
Görəndə gözümdən car oldu sellər.
Seyr etmir köysündə türfə gözəllər,
Sancılmır buxağa güllərin, dağlar [1, s.87].

Aşıq Ələsgərin ədəbi irsi bütünlükdə məzmunu, təsvir və təqdim üsulları, hadisələrə yanaşma tipologiyası ilə diqqət cəlb edir.

Müxtəlif məzmunlu şeirləri, məsələn, gözəllik mövzusunda yazdıqları ilə gözəllik nəğməkarı təsəvvürü bağışlayırsa, təbiət mövzusunda yazdıqları ilə təbiət şairi, ustadnamələri ilə əxlaq, mənəviyyat nəğməkarı kimi əlçatmazlıqda görünür. İctimai-siyasi məzmunlu şeirləri də məhz eyni səviyyəni sərgiləmək əvəzsizliyi ilə diqqət çəkir. Ustadın şeir təbi elə bir zənginlik və ecazkarlıqla səciyyələnir ki, onu yalnız özü ilə müqayisə etmək olar və ayrı-ayrı şeirlərinin ümumi axarında tipoloji təhlilə gətirməklə nitq janrlarında əks olunan sistemi müəyyənləşdirmək imkanı yarana bilər. Yunis Əmrədən Şah İsmayıla, Şah İsmayıldan da Molla Pənah Vaqifə qədər gələn yolun möhtəşəmliyi Aşıq Ələsgər və Səməd Vurğun şəxsində etnokulturoloji təfəkkür intelleksiyasının genelogiyasında dayananları tək-tək göz önünə gətirir və onun mükəmməllik formulunu cızmaq üçün faktlaşır. Dədə Qorqud qopuzunun, Qoç Koroğlunun üçtelli sazının, Xan Kərəmin tavar sazının sədalarından qopub süzülən səs dalğaları Aşıq Ələsgər yaradıcılığında yozumu mümkün olmayan qeyri-adiliyə yüksəlir. Sazın və sözün ecazkarlığı onun mənəvi (ruhani) dünyasında adı ilə bağlanacaq ucalığı diqqətə çəkir. “Dağlar” qoşmasından verdiyimiz bu nümunə dövr və mühit anlamında olanları diqqət önünə gətirməklə keçmiş və şahidi olduqları timsalında “dərdməndlər görsə, tez bağrı çatlar” bilgisini gələcəyə daşıyır. “Ələsgər yaradıcılığının xüsusiyyətlərini yalnız onun dövrü, mühiti və qüdrətli istedadı ilə izah etmək özü də birtərəflilik olardı. Çünki Ələsgərin bir aşıq kimi hərtərəfli formalaşmasında şeir ənənəmizin də mühüm rolu olmuşdur. Aşığın maraqlı və zəngin yaradıcılığına M.P.Vaqif, M.V.Vidadi, Ə.Nəbati kimi şairlərimizin, folklorumuzun, xüsusilə aşıq poeziyamızın xeyirxah təsiri olmuşdur” [10, s.13-14]. Təbiətin əsrarəngizliyindən, güllərin, çiçəklərin pıçıltısından, bulaqların şırıltısından, dağların vüqarı, əzəmətindən, Göyçə gölünün büllur sularından, göylərin əlçim buludlarından hopan bu ecazkarlıqlar Aşıq Ələsgər şeirlərinə əlavə ovqat qatmış, bir növ ona sığal çəkmişdir. Bu sığal bir istiqamətdə türkün yaşam fəlsəfəsinə, həyat prinsiplərinə, rübabın Füzuli ruhuna gətirdikləri ilə sazın Ələsgər düşüncəsinə çilədiklərinə bağlanmaqla kulturoloji sistemin bədii-estetik, tarixi-mədəni axarını sıralamışdır.

Əlahəzrət sözün və sənətin Ələsgər zirvəsi, həm də coğrafi məkan olaraq Göyçə fenomenini diqqət önünə gətirir, “hanı bu yaylaqda yaylayan ellər?” sorğu-sualı (harayı və ittihamı) “görəndə gözümdə car oldu sellər” cavabını da öz növbəsində nəticə olaraq ortaya qoyur. “Hanı mərd iyidlər, boş qalıb yurdu?” – deyən ustad bir növ xalqın ağrı-acılarla dolu tarixini bir misrada salnamə səviyyəsində sıralayır. Xan Qazanın, Ağam Beyrəyin, Qoç Koroğlunun, Dəli Alının at oynadıb, qalxan tutduğu, şeşpər atdığı yurd yerlərinin, qədim abidələrinin dağıdıldığını, yaddaşının

güllələndiyini, qan sızıldayan ruhunun acılarını tarix olaraq gələcəyə daşıyır, Göyçənin Vətən timsalında canlı obrazını yaradır:

Kəkotu, qırxbuğum, qaymaqçiçəyi,
Bənövşə, qantəpər, qızlar örpəyi,
Qoyun mələşməsi, çoban tütəyi,
Çəkir uzaqlara xəyalı, yaylaq!

Qırxqız, Alaqaya, Çilgöz, Harışlar,
Murov, Uzunyoxuş, Dəlidağ, Qoşqar!
Hansı oğul, deyin, sizi unudar?!
Düşərmi el sizdən aralı, yaylaq!? [1, s.99].

Aşıq Ələsgər şeirlərində söz sıralanmasının ecazkar, izahı heç bir nəzəri konsepsiyada sonadək mümkün olmayan nümunələri elə nəzərə çarpır ki, bunu yalnız aşığın öz dili ilə açmaq mümkündür. “Sözü xalqın ilk mürəbbisi” adlandıran müdriklər min illər boyu tarixin dərinliklərindən günümüzə sözlə qəlbini ovundurmaq, onun ilahi məqamlarına dayanmaqla gəlib çıxmışlar. M.Füzuli “sözün əndazəsi o qədər böyükdür ki, müəllimlər sözün məhsulu bildilər Quranı, duanı, vəhyi” – söyləyirdi. Aşıq Ələsgər də Göyçənin əsrarəngizliklərlə dolu gözəlliklərində könlünü sözə, saza verməklə dünyanın bu başından o başına gedib çata biləcək söz çələngi hörmüşdür. Təravəti, bənövşəni xatırladan görkəmi, göy qurşağı timsalındakı rəng çalarları zaman baxımından bizdən uzaqlaşdıqca, duyğu və ülviyyət qanadında bizə daha da yaxınlaşır, könül həmdəminə çevrilir, yaralarımıza məlhəm, təşnə olan ruhumuza sərinlik çiləyir. Məlum olduğu kimi, “sadəlik və aydınlıq şeir dilinin ən vacib şərtlərindən biridir. Bunun atributu, poetik başlanğıcı həyat materialının, təsvir obyektinin sənətkar tərəfindən tam şəkildə qavranılmasıdır. Təsvir və tərənnüm olunan anlayış o zaman aydın və sadə ifadə olunur ki, onu şair tam mənası ilə duyub, bütün incəliklərini dərk etsin. Belə olduğu təqdirdə şeirin poetik kontekstində şairin hiss-həyəcanları duyulur, həyəcanlı axtarışlar mətnin əsas leytmotivinə çevrilir” [4, s.63]. Ana laylası, bayatı, nəğmə qədər təravətli və ecazkar görünən Aşıq Ələsgərin şeirləri dilin və bədii təfəkkürün imkanlılıq və əlçatmazlıq örnəyidir. Sazın simlərindən qopan səs dalğalanmaları onun söz qatarı ilə elə uğurlu sıralanma müəyyənləşdirir ki, bunu informasiya yükü anlamında yalnız bədii düşüncənin kamillik örnəyi nümunə olaraq ortaya qoya bilər.

Bədii dərkin və bədii-estetik yüklənmənin formalaşdırdığı mənzərə sənətkar stixiyasının üfiqi və şaquli qatlarında bütün müstəvilərdə ancaq özü ilə ölçüləcək sənət kriteriyalarını sıralayır. "Arasında", "Bax-bax", "Varıymış", "Qanan ola", "Qoca baxtım", "Yetmədi", "Kəsildi", "Getdi", "Dayanmaz", "Olmaz", "Dünyada", "Eylər", "Yaman at", "Yandırır", "Yaxşıdı", "Gərəkdi", "Nəfslə-mərifət", "Nişanası", "Olacaqdı", "Çəkirsən", "Çıxıbdı" və s. örnəklərin hər biri Ələsgər dühasının nümunəsi olaraq bütün zamanlara işıq sala biləcək gücdədir.

Can deməklə candan can əskik olmaz,
Məhəbbət artırar, mehriban eylər.
Çor deməyin nəfi nədi dünyada,
Abad könlü yıxar, pərişan eylər.

Mən istərəm alim, mömin yüz ola,
Meyli haqqa doğru, yolu düz ola,
Diliynən zəbanı üzbəüz ola,
Ələsgər yolunda can qurban eylər [1, s.106].

Sözün həqiqi mənasında Aşıq Ələsgərin poeziyası bir tərəfdən də əxlaq, mənəviyyat toplusudur. Ustad kimi ədəb-ərkanında olanlar, nəsil-nəsil yaddaşlara daşınanlar, münasibət və xeyirxahlıq təsəvvürləri, etnosun yaxşılıq, dəyər anlamında nəyi varsa hamısı ustadın şeirlərinə bir çeşni olaraq sanki gözəgörünməzin əli ilə düzülür. Sazın simlərindən qopan ahəngdarlıq, musiqi sədaları onun ruhuna səpələnməklə, müdrikliyinin, mənəvi dünyasının daha dərin qatlarının hərəkətliliyi üçün əsas olur. Bütün bunların timsalında Aşıq Ələsgər "mənim sözüm doğru yoldan çıxanı, inşallah qaytarar düz insan eylər" qənaətinə gəlir. Bütün ruhu, varlığı ilə mənəvi ucalıqlara bağlanan və onun təlqin etdiklərinə doğru addım-addım irəliləyən sənətkar, həm də sazında, sözündə bu dəyərlərin ən qüdrətli təbliğatçısı kimi əsrarəngiz şeirləri ilə adını zamanın gərdişinə həkk etmişdir. "Aşıq Ələsgər möhürlü hər bir şeirdən xalqın yüz illəri aşıb gələn həyat təcrübəsi, dünyaduyumu, el müdrikliyini əks etdirən fəlsəfi ümumiləşdirmələri, gözəlliyin və mənəvi kamilliyin üzvi vəhdət təşkil etməsi istəyi ana axar kimi keçib gedir. Onun poetik mülahizələri təbii olduğu qədər bədii, sadə olduğu qədər də "məcazi danışa, məcazi gülə" səviyyəsində dərin və mükəmməldir. Bu poetik yanaşmalar vaxt, məkan, zaman sərhədləri tanımır, insanın könül dünyasına məxsus hüdudlar hara qədər uzana bilirsə, Aşıq Ələsgərin ustad sözləri – ustadnamələri də həmin üfüqlərə qədər qanad çalmaq gücündədir" [7,

s.533-534]. Daha doğrusu, özündə bir hüdudsuzluğu işarələyir, dəyər, mənəviyyat, həyat anlamında min illər boyu müəyyənləşmiş təsəvvürləri öz timsalında sonrakı zamanlara daşıyır.

Qafil könül, bu nə yoldu tutubsan,
Sərf edirsən nə kamaldı dünyada?!
Dövlətə qul olub, gül tək açılma,
Çox sənin tək güllər soldu dünyada.

Kibirdən qəlbində bərkitmə barı,
Top dəyər, dağıdar bürcü, hasarı.
Yüz sənin tək ahu gəzən şahmarı,
Fələk kəməndinə saldı dünyada [1, s.158].

Aşıq Ələsgər söz sərrafıdır, onun hər bir poetik örnəyinin əhatə etdiyi məzmun unikal strukturu, sözün və misranın məna yaddaşı, mətn daxilindəki yeri bütünlükdə özü səviyyəsində bir ucalığı işarələyir. Sözün hüsn gözəlliyi mətn daxilində həm də mənayaradıcı funksiyası ilə bütövləşməklə, paradiqmatik səviyyənin ümumi formulunu müəyyənləşdirir. Nitq etiketləri ilə sıralanan söz axarını ancaq qopuzun, sazın musiqi avazında ortaya qoyduğu mənzərə ilə müqayisə etmək olar. "Aşıq Ələsgərdə sözün hüsn bənzərsizliyi ilə fikrin libası, forması öz təkrarsızlığı ilə poetik zənginlik qazanır. Aşıq Ələsgərdə sözün poetikasının əsrarəngizliyi onun bədii libasının tilsimindədir ki, onu açmaq olduqca çətindir" [5, s.306]. Xalq dilinin zənginliklərinə köklənən sənətkar sözə sığal vermək, məna çalarlarının alt qatlarında olanları bir el ağsaqqalı, ustadlar ustadı olaraq elə cilalayır ki, onun vurduğu bəzək hər dövr üçün nümunəyə çevrilə bilir. "Bir şagird ki, ustadına kəm baxar, onun gözlərinə ağ damar-damar" ənənəsinə sadiq ustad öz timsalında nümunəyə çevrilməklə mühit, sənət ənənəsi üçün bir kriteriya müəyyənləşdirir. "Ələsgərlə Səhnəbanı", "Aşıq Ələsgərin Türkiyə səfəri", "Aşıq Ələsgər qarabağlıların yaylağında", "Aşıq Ələsgərin Qaraqoyunlu səfəri", "Aşıq Ələsgərin Dəli Alının toyuna gəlməsi", "Aşıq Ələsgər Yanşaqda", "Aşıq Ələsgərlə Həcər xanım", "Aşıq Ələsgərlə Aşıq Nəsibin qabaqlaşması", "Aşıq Ələsgərlə Şəmkirli Aşıq Hüseynin görüşü", "Aşıq Ələsgərnən Mir Məcid ağanın görüşü", "Aşıq Ələsgərlə Şair Nağı", "Anaxanımın küsməyi", "Aşıq Ələsgərin Qarabağ səfəri", "Aşıq Ələsgərin İrəvan səfəri", "Aşıq Ələsgər Kəlbəcərin Qılışlı kəndində", "Aşıq Ələsgərin Şınıq səfəri", "Bəşirin Molla Rəhimi vurması", "Qoca baxtım", "Dəyirmançı aşıq", "Aşıq Ələsgərlə Aşıq Hüseyn Bozalqanlının görüşü", "Aşıq Ələsgərin Gəncə səfəri", "Aşıq Şenliklə Aşıq Ələsgərin görüşü", "Aşıq Ələsgər dastanı" və s. dastan-rəvayətlər məhz

bu sevginin, ustad şəxsiyyətinə, yaradıcı istedadına məhəbbətin örnəyi olaraq xalqın bağrından qoparaq yaşarlıq qazanmışdır. “Dəryalardan ləlü-gövhər seçən”, “pərvazlanıb Qafdan-Qafa uçan” Aşıq Ələsgər bülbül cəh-cəhini xatırladan söz gülşəni ilə ürəkləri ovsunlamış, hər bir şeiri ilə ayrıca sənət abidəsi yarada bilmək imkanını ortaya qoymuşdur [A.Ələsgər. Bakı, 1990].

Arif məclisində bir söz söylərəm,
Nə hədyan, nə çaşqın, nə qələt olmaz.
Nütfədən pak olan, loxmadan halal,
Mərifət elminə nabələd olmaz [1, s.158].

**Nəticə / Conclusion**

Rəngarəng poetik örnəkləri, yüksək sənət intelleksiyası ilə yaddaşlarda yaşayan Aşıq Ələsgər mərifət elmində kamillik zirvəsinə yüksəlmişdir. Qopuzun, sazın min illərin dərinliklərindən daşıyıb gətirdiklərinə köklənən və onun ecazkarlığına adı ilə bağlanacaq əlavələri edən, söz mülkünə bir ölümsüzlüklə daxil olan ustad, həm də öz timsalında müəyyənləşdirdiyi bir sənət kriteriyası ilə diqqət önünə gəlir. Alp-ərənlərin at çapıb, qılınc oynatdığı Oğuz elləri öz müdrikliyinə işıq tutmaqla Aşıq Ələsgərə qədər şərəfli bir sənət ənənəsinin yolunu nümunə olaraq ortaya qoymuşdur. Göyçənin əsrarəngiz gözəlliklərindən boy göstərən və sənət ənənəsini mühit timsalında yeni zirvələrə qaldıran ustad yüz illər boyu adı ilə bağlanacaq və meyar ola biləcək ucalığı müəyyənləşdirmişdir. Bu, Dədə Ələsgər ucalığıdır.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Aşıq Ələsgər. (1972). 2 cilddə, I cild. Bakı, Elm. 326 s.
2. Aşıq Ələsgər. (1972). 2 cilddə, II cild. Bakı, Elm. 328 s.
3. Aşıq Ələsgər. (1999). Əsərləri, dastan-rəvayətlər, xatirələr. Bakı, Şərq-Qərb. 578 s.
4. Hüseynov M. (2008). Dil və poeziya. Bakı, Elm. 434 s.
5. Hüseynov M. (2017). Aşıq Ələsgərin söz ümmanı. Bakı, Elm və təhsil. 312 s.
6. Qarayev Y. (2000). Göyçəyə qayıdan yol folklordan keçir. Azərbaycan folklor antologiyası. Göyçə folkloru. Bakı, Səda, s.3-15.
7. Qasımlı M. (2017). Folklor və ədəbiyyat araşdırmaları. Bakı, Elm və təhsil. 628 s.
8. Qurbanov B. (2011). Ustad aşıq, poeziyamızın klassik şairi Aşıq Ələsgər.
9. Sarıvəlli O. (1974). Seçilmiş əsərləri. 3 cilddə, II cild. Bakı, Azərnəşr. 252 s.
10. Sarıvəlli O. (2011). Qüdrətli şair, ustad sənətkar. Bakı, Avropa. 128 s.
11. Təhmasib M.H. (1972). Gözəllik nəğməkarı. Aşıq Ələsgər. 2 cilddə, I cild. Bakı, Elm, s.5-52.